*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 69, №2, səh. 134 (2014)*

# TƏRƏVƏZ BITKILƏRİNDƏ QARIŞIQ VİRUS İNFEKSİYALARI HAQQINDA İLK MƏLUMAT

**İ.M. Hüseynova*, N.F. Sultanova, Ə.Ç. Məmmədov, C.Ə. Əliyev**

*AMEA Botanika İnstitutu, Badamdar şossesi, 40, Bakı AZ1073, Azərbaycan;*
** E-mail: huseynova-i@botany-az.org*

Son dövrlərdə virusologiya elmində prioritet istiqamət hesab edilən müxtəlif patogenlər ilə sahib bitki arasındakı mürəkkəb qarşılıqlı əlaqələrin öyrənilməsi baxımından qarışıq infeksiyaların aşkarlanması və onların bitkilərdə əmələ gətirdikləri xəstəlik simptomlarının öyrənilməsi, müxtəlif virus növləri arasında mövcud filogenetik əlaqələrin araşdırılması olduqca böyük əhəmiyyətə malikdir.

Azərbaycanda ilk dəfə olaraq Abşeron yarımadasından toplanmış virus xəstəliyinin xarakterik simptomlara malik 52 müxtəlif tərəvəz bitkisi qısa müddət ərzində eyni vaxtda çoxlu sayda nümunəni analiz etməyə imkan verən spesifik immunostriplərdən (test-zolaqlardan) istifadə etməklə müasir seroloji metod olan diaqnostik test-sistemin köməyi ilə RNT-genomlu viruslara qarşı anticisimcikləri müəyyən etmək məqsədilə yoxlanılmışdır. Nəticədə bibər (*Piper longum* L.) bitkisinin iki nümunəsində kukumoviruslara aid ***Cucumber mosaic virus*** (CMV), dörd nümunədə tobamoviruslara aid ***Pepper mild mottle virus*** (PMMoV) və 2 nümunədə isə 4 virus - tobamoviruslara aid 3 virus - ***Tomato mosaic virus*** (TMV), ***Tobacco mosaic virus*** ($T_0$MV), ***Pepper mild mottle virus*** (PMMoV) və tospoviruslara aid ***Tomato spotted wilt virus*** (TSWV) qarışıq şəkildə aşkar edilmişdir. Eyni zamanda 12 pomidor (*Solanum lycopersicum* L.) nümunəsində tobamoviruslara aid 2 qarışıq virus (TMV, $T_0$MV), 4 nümunədə tospovirus TSWV, 2 nümunədə kukumovirus CMV və 4 pomidor nümunəsində isə 3 qarışıq infeksiya (TMV, $T_0$MV və TSWV) aşkar edilmişdir. Yemiş (*Cucumis melo* L.) bitkisinin iki nümunəsində karmoviruslara aid ***Melon necrotic spot virus*** (MNSV), iki nümunədə potiviruslara aid ***Zucchini Yellow Mosaic Virus*** (ZYMV), üç nümunədə komovirislara aid Squash mosaic virus (SqMV) və bir nümunədə SqMV + ZYMV qarışıq şəkildə viruslar aşkar edilmişdir.